UOT. 619:576.89; 619; 616.995.1

# ŞƏKİ-ZAQATALA BÖLGƏSİNDƏ XIRDA BUYNUZLULARDA HELMİNTOZLARLA YOLUXMANIN EPİZOOTİK VƏZİYYƏTİ

**N.H.HƏSƏNALIYEV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Helmintozların epizootik vəziyyətini öyrənmək məqsədilə Şəki-Zaqatala bölgəsinin heyvandarlıq təsərrüfatlarında saxlanılan xırda buynuzlulardan 250 kal nümunəsi və patoloji material götürülərək müayinə edilmişdir. Alınan nəticələr bölgənin dağlıq, dağətəyi, düzənlik ərazilərinə və ilin fəsillərə əsasən təhlil edilmişdir.*

***Açar sözlər:*** *Helmintoz, biosenoz , epidemioloji, epizootoloji*

Helmintlər biosenozun bir komponenti kimi onun dinamikasında mühüm dərəcədə rol oynamaqla yanaşı, epidemioloji və epizootoloji əhəmiyyətə malikdir. Onlar həm yetkin, həm də sürfə mərhələsində müxtəlif biosenotik yollarla axırıncı və araliq sahiblərin daxilinə düşərək orqanlarda parazitlik edir, onların normal inkişafına, nəsilvermə qabiliyyətinə, çoxalmasına yayılmasına əngəllər törədir. Şəki-Zaqatala bölgəsində ev heyvanları üçün çox təhlükə torədən helmintoz törədicilərinin təbii ocaqlarının saxlanmasında vəhşi məməlilərin rolunun aşkar edilməsi, helmintlərin ilin fəsilləri və landşaft-ekoloji zonalar üzrə yoluxma dərəcəsi, helmint faunanın formalaşması yolları və digər səbəblər bu günə qədər özünün müsbət həllini tapmamışdır. Heyvanlar arasında sorucu qurdların əmələ gətirdiyi helmintozlar - fassiolyoz, diktiokaulyoz, moniezioz respublikanın bütün təbii iqlim zonalarında geniş yayılmışdır. Aparılmış elmi-tədqiqat işləri göstərir ki, heyvandarlıq təsərrüfatlarında helmintozlara qarşı dehelmintizasiya tədbirlərinin vaxtında aparılmasına baxmayaraq bu xəstəliklər müşahidə olunmaqda davam edir.

Şəki-Zaqatala bölgəsi respublikanın şimal-şərqində yerləşib, şimal-qərbdən və cənubdan az bir hissədən Alazan çayı boyu Gürcüstan Respublikası, şimaldan Böyuk Qafqazın cənub yamacı boyu Göyçay çayının başlanğıcına qədər, şimaldan Rusiya Federasiyası ilə, eləcə də cənubdan Alazan- Həftaran vadisi və Acınohur ön dağlıq hissəsində Samux rayonu və cənub–şərqdə Ağdaş və Göyçay rayonları ilə sərhəddir. Bölgə Böyuk Qafqaz sıra dağlarının cənub yamaclarında yerləşir. Bölgə Balakən, Zaqatala, Qax, Şəki, Oğuz və Qəbələ inzibati rayonlarını əhatə etməklə, ümumi sahəsi 883.5 min ha və ya respublika ərazisini 10, 2%-ni əhatə edir. Relyefi əsasən dağlıqdır. Dağlıq ərazi özlüyündə yüksək dağlıq, orta dağlıq, dağətəyi və düzənlik qurşaqlara bölünür.

Şəki-Zaqatala bölgəsinin təbiətinin belə zəngin olması, iqlimin rütubətliliyi helmint faunanın zəngin olmasına gətirib çıxarır. Bu isə burada saxlanılan xbh-ın (qoyun, keçi) helmintoz törədicilərinin yayılmasına şərait yaradır.

**Tədqiqatın material və metodları.** Şəki-Zaqatala bölgəsində köçəri və oturaq həyat tərzi keçirən heyvandarlıq təsərrüfatlarında helmintozların epizootik vəziyyətini öyrənmək məqsədilə, 2016-2017 ci-illər ərzində fəsillər üzrə Şəki, Oğuz, Zaqatala rayonlarının dağlıq, dağətəyi və düzənlik ərazilərində saxlanılan xbh-dan müayinə üçün 250 kal nümunəsi və məcburi kəsilmiş heyvanlardan patoloji materiallar, daxili orqanlar, bağırsağın ayrı-ayrı hissələri götürülərək müayinə edilmişdir.

**Alınan nəticələr və onların təhlili.** Götürülmüş nümunələr "Parazitologiya" laboratoriyasında müayinədən keçirilmiş, yoluxmanın ekstensivliyi və intensivliyi hesablanmış, alınan nəticələr rayonlar üzrə təhlil edilmişdir. Nəticələr cədvəldə əks olunmuşdur.

**Cədvəl**

**Şəki, Zaqatala, Oğuz rayonlarında xırda buynuzlularda helmintozlarla yoluxmanın epizootik vəziyyəti.**

| Rayonlar | Kal nümunələri | Trematod | | Sestod | | Nematod | |
|---|---|---|---|---|---|---|---|
| | | ədəd | % | ədəd | % | ədəd | % |
| Şəki | 95 | 25 | 26, 31 | 36 | 37, 89 | 34 | 35, 78 |
| Zaqatala | 80 | 45 | 56, 25 | 15 | 18, 75 | 20 | 25, 0 |
| Oğuz | 75 | 35 | 46, 66 | 20 | 26, 66 | 20 | 26, 66 |

Şəki rayonun dağlıq, dağətəyi və düzənlik ərazilərindən götürülmüş 95 kal nümunəsinin müayinəsi zamanı 25 nümunədə trematod yumurtaları (26, 31%), 36-da sestod yumurtaları (37, 89%), 34-də nematod yumurtaları (35, 78%) aşkar edilmişdir.

Zaqatala rayonunun dağlıq, dağətəyi və düzənlik ərazilərindən götürülmüş 80 kal nümunəsinin müayinəsi zamanı 45 nümunədə trematod yumurtaları (56, 25%), 15-də sestod yumurtaları (18, 75%), 20-də nematod yumurtaları (25, 0%) aşkar edilmişdir.

Oğuz rayonun dağlıq, dağətəyi və düzənlik ərazilərindən götürülmüş 75 kal nümunəsinin müayinəsi zamanı 35 nümunədə trematod yumurtaları (46,

66%), 20-də sestod yumurtaları (26, 66%), 20-də nematod yumurtaları (26, 66%) aşkar edilmişdir.

Rayonlar üzrə helmint növlərin intensivlik dinamikası qrafikdə verilmişdir. Qrafikdən göründüyü kimi, trematodlarla yoluxmanın intensivliyi Zaqatala və Oğuz rayonlarında, sestod və nematodlarla Şəki rayonunda yüksək olmuşdur.

**Qrafik**




Aşkar edilmiş helmintlərin növ tərkibini təyin edərkən Şəki rayonunda trematodlardan *Fasciola hepatica* geniş yayılmışdır. XBH-ların fassiolyozla yoluxması, əsasən, yayın sonu və payizin əvvəllərində müşahidə edilir. Rayonun daglıq və dağətəyi ərazilərində sestodlardan *Moniesia expansa*, *Moniesia benedeni* aşkar edilmişdir. Rayonun dağlıq və dağətəyi ərazilərində köçəri qoyunçuluq təsərrüfatlarında, çaykənarı sahələrdə, suvarılan otlaqlarda, nəmliyi çox olan çəmənliklərdə saxlanılan heyvanlarda tənəffüs yolları nematodlarından diktiokaulyozla (Dictyocaulus filaria) yoluxmanın ekstensivliyi yüksək olmuşdur (27, 3%).

Mədə-bağırsaq nematodlarından *Haemochusus contortus, Chabertia ovina, Strongyloides papillosus* dağətəyinə yaxın düzənliklərdə otarılan qoyunlar arasında da qeydə alınmışdır. Yoluxma yazın sonu, yay və payızın əvvəllərində müşahidə edilir.

Zaqatala rayonunun dağlıq, dağətəyi ərazilərində trematodlardan- *Dicroselium lanceatum*, düzənlik ərazilərində *Fasciola hepatica* aşkar edilmişdir. Rayonun dağlıq , dağətəyi ərazilərində və yaylağa köçmüş köçəri təsərrüfatlarda saxlanılan xbh-da *M.expansa*, *M.benedeni* növləri yüksək intensivliklə aşkar edilmişdir. Mədə-bağırsaq nematodları *Ostertagia circumcincta, Cooperia punctata, C. oncophora, Nematodirus oirasianus, Chabertia ovina* növləri aşkar edilmişdir.

Oğuz rayonunun dağlıq, dağətəyi ərazilərində trematodlardan *Dicroselium lanseatum*, düzənlik ərazilərində *Fasciola hepatica* aşkar edilmişdir. Fərdi və fermer təsərrüfatlarında aparılan tədqiqatlar göstərir ki, digər rayonlarla müqayisədə mədə-bağırsaq nematodozları ilə yoluxmanın ekstensivliyi burada daha yüksək müşahidə edilmişdir. Helmintoz törədiciləri - *Haemochusus contortus, Ostertagia circumcincta, Cooperia punctata, C.oncophora, Nematodirus oirasianus, Chabertia ovina* növləri qeyd edilmişdir.

**ƏDƏBİYYAT**

**1.**A.Q.Məmmədov, Y.H.Hacıyev, N.M.Şirinov, Ə.Ə.Ağayev Baytarlıq parazitologiyası. 1986. **2.**Məmmədov A.Q. Heyvanların başlıca qurd (helmint ) xəstəlikləri və onlara qarşı mübarizə tədbirləri. **3.** Y.H.Hacıyev , A.Ə.Alıyev, B.X.Qarayev Azərbaycanda heyvanların fassiolyozu və ona qarşı mübarizə tədbirləri. **4.** K.İ.Skryabin Helmintologiya I-IV ANNUS VI 1965. **5.**A.C.Qayıbov, A.Q.Məmmədov Kənd təsərrüfatı heyvanlarının fassiolyozu və onlarla mübarizə tədbirləri. Elm nəşriyyatı Bakı 1969, səh 55-72. **6.** C.M.Əsədov. Azərbaycanda kənd təsərrüfatı heyvanlarının helmint və helmintozlarının zonalar üzrə yayılması və helmintozlarla mübarizənin gücləndirilməsi üçün təkliflər Bakı 1975. **7.** Р.С.Шульц, Е.В.Гвоздев Основы общей гельминтологии том 11 Биология гельминтов Москва 1972.

**Эпизоотическая ситуация по заражению гельминтозми мелкого рогатого скота в регионе Шеки-Закатала.**

**Н.Г.Гасаналиев**

С целью изучения епизоотической ситуации в животноводческих хозяйствах Шеки-Закаталского региона исследованию было подвернуто 250 каловых овразцов и гельминтологический материал .Исследования проводились по сезонам года в низменной, предгорной и горной зонах данного региона.

***Ключевые слова:*** *Гельминтоз, биоценоз, эпидемиологическое, эпизоотологическое*

**Epizootic situation of helminth infection of small cattle in the region of Sheki-Zagatala**

**N.H.Hasanaliyev**

Epizootologicol situation in livestock farms of Shaki-Zakatala region to study of small cattle was subjected 250 fecal samles anol helminthological material .Studies were conducted on the season in the low-lying.foothill and mountain areasthis region.

***Key words:*** *Helminthiasis, biocenosis, epidemiological, epizootic.*